informasiyanın, intellektual resursların birləşdirilməsi ilə müəyyən edilir. Bu gün müxtəlif ölkələr informasiya cəmiyyətinə doğru irəliləyişin müxtəlif mərhələlərində yerləşiblər ki, bu da onlarda demokratik prinsiplərin və vətəndaş cəmiyyətinin əsaslarının inkişaf dərəcəsi, iqtisadiyyatın, informasiya və telekommunikasiya texnologiyalarının və digər əhəmiyyətli texnoloji, siyasi və sosial amillərin inkişaf səviyyəsi ilə müəyyən edilir. İnformasiya cəmiyyətinə daxil olma ilə bağlı proseslərinin inkişaf dərəcəsinə uyğun olaraq, müxtəlif inkişaf səviyyələrinə mailk olan ölkələr keçid dövrünün problemləri ilə müxtəlif dərəcədə və səviyyədə qarşılaşırlar. Məsələn, artıq inkişafın müasir mərhələsində inkişaf etmiş ölkələr üçün "insan böhranı" adlı fenomen yavaş-yavaş sosial inkişafın əhəmiyyətli və əvvəllər nəzərə alınmayan bir amilinə çevrilir. Bu gün inkişaf etmiş ölkələrdə yaşayan insan böyük məlumat axınının təsirinə məruz qalır, lakin burada bir şeyi nəzərə almaq lazımdır ki, onun bu informasiyanı tam anlamaq imkanları heç də sonsuz deyildir. Bu isə ona gətirib çıxardır ki, bəzi məlumatlar, ümumiyyətlə, şüurlu surətdə tez qavranıla bilmir. Buna görə də son zamanlar, birinci − insanların sosial-siyasi həyatın real problemlərindən dinə, transsendental fəlsəfəyə (idrakın təcrübədən asılı olmadığını iddia edən idealist fəlsəfi nəzəriyyə), virtual aləmə çəkilmələri daha tez-tez baş verir; ikinci isə − ruhi xəstəliklərlə xəstələnənlərin və intihar edənlərin sayı artır. Başqa bir problem isə ondan ibarətdir ki, yüksək texnologiyalara əsaslanan cəmiyyət inkişaf etdikcə, əhalinin bir çox təbəqələrinin sosial həyatdan kənarda qalma riski də artır. Bura, ilk növbədə, yeni rəqəmsal avadanlıq almaq və kompüter şəbəkələrində işləmək imkanı olmayan aztəminatlı vətəndaşlar daxildir. Eyni zamanda sadalanan problemlərlə yanaşı, yeni informasiya-kommunikasiya texnologiyalarından istifadə etməyi istəməmək və yaxud da bunu edə bilməmək problemi də mövcuddur ki, bu da istehlakçıdan yeni keyfiyyətlərə − yüksək səviyyəli mücərrəd təfəkkürə, cəld reaksiyaya, yeni texnologiyaların və texniki vasitələrin daim öyrənilməsinə hazır olmaq, daima özünün təhsilini təkmilləşdirmək kimi keyfiyyətlərə yiyələnməsi tələbi ilə bağlıdır. Əlbəttə ki, burada bir şeyi nəzərə almaq lazımdır ki, Avropa İttifaqının bir sıra sənədlərində qeyd olunduğu kimi, məhz informasiya cəmiyyətinə keçid yeni məşğulluq imkanları da yaradır. Eyni zamanda, qloballaşma dövrünün inkişaf etmiş ölkələri üçün ən mürəkkəb və həlli mümkün olmayan sosial problemlərdən biri, əhalinin bir hissəsinin marginallaşmasıdır. Müasir şəraitdə bu, heç də ümidsiz yoxsulluq içində yaşamaq demək deyil. Söhbət "informasiyalaşmış" iqtisadiyyatda özünə yer tapa bilməyən, müxtəlif səbəblərdən çoxluq tərəfindən qəbul edilən dəyərlər və sosial münasibətlər sistemi ilə ziddiyyət təşkil edən insanlardan gedir.

XXI əsrin əvvəli üçün həyatımızda yeni olan və bundan irəli gələrək hələ az öyrənilmiş sosial problemlər də getdikcə daha da artır və kəskin xarakter alır. Bunlara misal olaraq informasiya təhlükəsizliyi problemini, insanın şəxsi həyatının İKT-dən (İKT − informasiya və kommunikasiya texnologiyaları; kompüter texnologiyası cihazlarından, habelə telekommunikasiya vasitələrindən istifadə etməklə həyata keçirilən informasiya ilə qarşılıqlı əlaqə prosesləri və üsullarıdır) istifadə etməklə icazəsiz müdaxilə və nəzarətdən qorunmasını (Əliquliyev, Mahmudov, 2019:21-24; 7), şüurun manipulyasiya edilməsini, informasiya cinayətkarlığını (10), informasiya xəstəliklərini, informasiya müharibələrini və s. göstərmək olar. Mütəxəssislərin fikrincə, bu gün informasiya müharibələri öz effektivliyinə görə artıq, kütləvi qırğın silahlarından istifadə edilməsi halı ilə müqayisə olunur.

Bildiyimiz kimi, informasiya mühiti informasiyanın toplanmasını, işlənməsini, müəyyən maddi daşıyıcıda təsbitini, habelə zaman və məkanda saxlanmasını və ötürülməsini təmin edən texniki vasitələr əsasında formalaşır. Tipoqrafiya, jurnalların nəşri, kataloqlar, indekslər və s. bütün bunlar elm və texnikanın müəyyən nailiyyətlərinə əsaslanırdı və cəmiyyət tərəfindən məhz məlumatın və onun tərkibində olan biliklərin ötürülməsi üçün yaradılmışdır. Müasir şəraitdə informasiyanın ötürülməsi yeni informasiya və kompüter texnologiyalarına əsaslanır ki, onun da inkişafı sayəsində prinsipcə yeni informasiya mühiti formalaşır.

Müasir dünyada bəşəriyyətin qarşısında duran əsas problemlərindən biri məhz informasiyanın kəmiyyətcə həddən çox artmasıdır. Əlbəttə ki, dünya üzrə bu artımın sürəti və həcmi haqqındakı məlumat təxmini xarakter daşısa da, onun sel, qar uçqunu xarakteri alması artıq göz qabağındadır. Hazırda dünyada yaradılan məlumatların ümumi həcmi təxmini və müxtəlif mənbələrin hesablamalarına görə 12 ayda (digər mənbələrələ görə 6 ayda) təxminən iki dəfə artır. İnformasiyanın həcminin bu cür sürətlə artması "informasiya partlayışı" adlanır.

İnformasiya aləmində kəmiyyət artımı ilə yanaşı, keyfiyyət dəyişiklikləri də baş verir. Bu, onun məzmununun, strukturunun, təqdimat formasının və məlumatların qeydə alındığı medianın dəyişməsində özünü göstərir. Məlumatın məzmununun dəyişməsində bir sıra məqamları qeyd etmək lazımdır. Bunlar:

1. İnformasiyanın beynəlmiləlləşməsi və qloballaşması baş verir;
2. Cəmiyyətin informasiya ehtiyatları genişlənir, yeni informasiya məhsulları və xidmətləri yaranır;
3. Məlumatın yenilənməsi sürəti artır;
4. İnformasiyanın differensasiyası və ixtisaslaşması əhəmiyyətli dərəcədə artır və s.

Həyatımızda baş verən proseslər "informasiya cəmiyyəti"nin müsbət tərəfləri ilə yanaşı, mənfi çalarlara da malik olduğunu özündə büruzə verir. Belə ki, XXI əsrdə dünyanı obyektiv şəkildə əks etdirən yüksək keyfiyyətli informasiyanın əhəmiyyətli dərəcədə artması ilə yanaşı, həcminin təhrif olunmuş, deformasiyaya uğramış məlumatların həcmi də getdikcə artır ki, bu da bir tərəfdən həmin məlumatı yaradanların subyektiv yanaşmasından, onların qeyri-obyektiv və ya səriştəsiz olmalarından, digər tərəfdən isə həmin məlumatın məqsədyönlü dezinformasiya xarakterli olması səbəbindən baş verir. "İnformasiya cəmiyyəti"ndə mövcud olan digər bir mənfi çalar isə ayrı-ayrı fərdlərin və ya kiçik insan qruplarının, məsələn, hakerlərin dövlət arxivlərinə müdaxilə etmələrini, hərbi və ya kəşfiyyat xarakterli məlumatların ələ keçirilməsini, bank sistemlərini sındıraraq özlərinin hesablarına böyük məbləğdə pul köçürə bilmələrini, ayrı-ayrı insanların şəxsi məlumatlarının və foto şəkillərinin icazəsis, gizli, oğurluq yolu ilə ələ keçirilməsini və s. göstərə bilərik (informasiya texnologiyalarının şəxsi həyata nüfuz etməsi fərdi məlumatların toxunulmazlığına təhlükə yaradır. "İnformasiya cəmiyyəti"nə necə yanaşmağımızdan asılı olmayaraq, onun inkişafındakı əsas tendensiyalar həmişə bizdə bir tərəfdən sevinc, fərəh, heyranlıq hissi oyadırsa, digər tərəfdən o, bizdə hiddət, qəzəb, ikrah hissinin yaranmasına da səbəb olur). Müasir medianın ictimai şüurun formalaşmasına dağıdıcı təsir göstərə bilmək imkanını da kənara atmaq olmaz.

Cəmiyyətin "informasiya cəmiyyəti"nə keçidi zamanı insanlar bəzən belə bir əhəmiyyətli problemlə də üzləşə bilirlər: insanların bir qismi yeni bilik və texnologiyalardan istifadə edə bilənlərə və bu cür bacarıqlara malik olmayanlara bölünür ki, bunun da nəticəsində informasiya texnologiyaları kiçik bir sosial qrupun əlində cəmləşir, bu isə gələcəkdə müəyyən problemlərin yaranmasına səbəb olur (hələlik, bu özünü əsasən işçinin işə qəbulunda daha çox göstərir).

Bu gün keyfiyyətsiz və ya kifayət qədər yüksək keyfiyyətli, lakin lazımsız, zəruri olmayan informasiya artıq (lazımsız) informasiya kimi qəbul edilir. Əvvəldə qeyd etdiyimiz "informasiya partlayışı"nın da baş verməsinin ən mühüm səbəblərindən biri, məhz bu böyük həcmdə lazımsız məlumatın mövcud olması və əhaliyə təqdim edilməsidir.

Beləliklə, sivilizasiyanın informasiya baxımından indiki inkişaf mərhələsinin informasiya böhranı ilə müşayiət olunduğunu iddia etmək olar. İnformasiya böhranı "informasiya aclığı" və "informasiya partlayışı"nın ziddiyyətli vəhdətində, yəni onun həddindən artıq istehsalı şəraitində, informasiyanın çatışmazlığında özünü büruzə verir. Bu fenomenin necə adlandırılmasından asılı olmayaraq "informasiya partlayışı" və ya "informasiya böhranı" − informasiya kommunikasiyalarının inkişaf tarixi göstərir ki, əlifbanın (yazının) yaranması ilə müxtəlif dillərdə yığılmış məlumatın həcmi və onun ayrıca götürülmüş şəxs tərəfindəm mənimsənilməsinin məhdud imkanları arasında ziddiyyət yaranmışdır. XX əsrin sonundan etibarən daha sürətli olan elektron informasiyanın meydana çıxması ilə bu ziddiyyət daha da kəskinləşmişdir. Müasir informasiya böhranını bütün əvvəlkilərdən fərqləndirən mühüm xüsusiyyət ondan ibarətdir ki, bu XX əsrin ikinci yarısından sonra ETİ-nin təsiri ilə elm və texnikada baş vermiş ciddi daxili dəyişikliklərin nəticəsində baş vermişdir.

İnformasiyanın xarakterində baş verən keyfiyyət dəyişiklikləri də böyük əhəmiyyətə malikdir. Peşəkar fəaliyyətdə qarşıya çıxan məsələləri həll etmək üçün bu gün mütəxəssisə təkcə ixtisası ilə bağlı məlumata deyil, həm də əhəmiyyətli miqdarda əlaqəli (bir-birinə çox yaxın, qonşu) informasiyaya da ehtiyac duyulur. Alimlərin fikrincə, mütəxəssis, alim üçün zəruri olan informasiyanın həcminin artması, fərdin onu emal etmək (baxmaq, qiymətləndirmək, təhlil etmək, onun əsasında yeni biliklər yaratmaq) qabiliyyətini xeyli üstələyir.

Bu gün informasiyaya və biliyə yiyələnmək, geniş əhali kütləsi üçün sosial əhəmiyyətli informasiyanın əlçatanlığını təmin etmək − bunlar qarşıdakı onilliklərdə sivilizasiyanın inkişafı üçün vacib olan iki əsas vəzifədir. XXI əsrdə peşəkar ixtisaslı mütəxəssis o şəxsi hesab etmək olar ki, o, peşəkar bilik və bacarığı

ilə yanaşı, informasiya cəmiyyətinin onun qarşısında açdığı yeni imkanlardan öz fəaliyyətində səmərəli istifadə etmək bacarığına da malik olsun. Müasir dövrdə informasiya cəmiyyətinin mütəxəssisin qarşısında açdığı yeni imkanlar içərisində, ilk növbədə korporativ, milli və beynəlxalq informasiya şəbəkələri tərəfindən təmin edilən müxtəlif növ informasiya ehtiyatlarından istifadə imkanları və bacarığını göstərmək olar.

## Nəticə

Buradan belə bir nəticə çıxartmaq olar ki, bu gün bütövlükdə informasiya mədəniyyəti və onun zəruri komponenti olan informasiya səriştəliliyi cəmiyyətin yeni informasiya mühitində şəxsiyyətin uğurlu sosiallaşmasını şərtləndirən əsas amillərdən birinə çevrilir. Bildiyimiz kimi, əvvəllər bu tələblər cəmiyyətin bütün üzvlərinə deyil, yalnız özünü informasiya sahəsində peşəkar fəaliyyətə hazırlayanlara şamil edilirdi.

Beləliklə, cəmiyyətin yeni informasiya mədəniyyətinin formalaşması və fərdin informasiya səriştəsi mürəkkəb, çoxölçülü, bir-biri ilə əlaqəli problemlərdir və onların həlli ölkənin milli və informasiya təhlükəsizliyinin təmin edilməsi, elmin və iqtisadiyyatın inkişafı, mədəniyyətin qorunub saxlanması problemi, o cümlədən həyatı və fəaliyyəti artıq bu gün prinsipcə yeni informasiya mühitində cərəyan edən insanın peşəkar və şəxsi uğurları ilə sıx bağlıdır. Yəni, artıq XXI əsrdə həyatımızı bu informasiya texnologiyalarından kənarda təsəvvür etmək mümkün deyil və onun bütün sahələrdə tətbiq edilməsi prioritetdir (11; Yusifova, 2018: 49-52). Dövlətimizin başçısı İlham Əliyevin 3 saylı DOST mərkəzinin açılışında Azərbaycan Televiziyasına müsahibəsində (19.05.2020-ci il) qeyd etdiyi kimi, "...bu sahə, hər kəs bunu bilməlidir, gələcəyə atılan addımdır. Biz gecikə bilmərik, yubana bilmərik, geciksək uduzarıq. Ona görə bütün resurslarımızı, o cümlədən maliyyə, intellektual və kadr resurslarımızı səfərbər etmişik. Əminəm ki, gələcək illərdə Azərbaycan informasiya-kommunikasiya texnologiyaları sahəsində liderlik mövqelərini daha da möhkəmləndirəcək" (12).

## Ədəbiyyat

1. Əliquliyev, R.M., Mahmudov, R.Ş. (2014). İnformasiya cəmiyyətində iqtisadiyyatın transformasiyası məsələləri − "Elektron dövlət quruculuğu problemləri". I Respublika elmi-praktiki konfransı, Bakı, s.178-181.
2. Məmmədov, M.M. İnformasiya iqtisadiyyatı. https://drive.google.com/file/d/0B1n5hFtntvn-CWGhJZkVoYlRac2s/view?resourcekey=0PHYN8P9KRph3uCChbvOePw
3. Əhmədova, A.S. (2009). İnformasiya cəmiyyətinin qurulmasında informasiyalaşdırmanın rolu və dövlət siyasəti. Dövlət idarəçiliyi: nəzəriyyə və təcrübə, № 3(27), s.163.
4. "İnformasiya, informasiyalaşdırma və informasiyanın mühafizəsi haqqında" Azərbaycan Respublikasının Qanunu. Bakı şəhəri, 3 aprel 1998-ci il, № 460-IQ. https://e-qanun.az/-framework/3525
5. "Azərbaycan − 2020: gələcəyə baxış" inkişaf konsepsiyası. https://azertag.az/sites/default/files/Bolmeler/inkishaf-konsepsiyasi_2020.pdf
6. Yusifova, S.F. (2018). "İnformasiya cəmiyyəti" və Azərbaycan. "Geostrategiya" aylıq ictimai-siyasi jurnal, Bakı, № 05(47), sentyabr-oktyabr, s.49-52.
7. Yusifova, S.F. (2016). Qloballaşan dünyamızda informasiyanın rolu. Multikulturalizm Azərbaycanın dövlət siyasəti və cəmiyyətin həyat tərzidir. IV Beynəlxalq Elmi Konfrans, Azərbaycan Universiteti, Bakı, s.77-82.
8. İnformasiya cəmiyyəti və onun inkişaf mərhələləri. http://benbiliyordummu.blogspot.com/-2018/11/informasiya-cmiyyti-v-onun-inkisaf.html
9. Əliquliyev, R.M., Mahmudov, R.Ş. (2019). Milli mentalitetdə fərdi məlumatların yeri və onların mühafizəsi problemləri. "İnformasiya təhlükəsizliyinin aktual multidissiplinar elmi-praktiki problemləri". V Respublika Konfransı. Bakı, s.21-24.
10. Qadağan olunmuş xəbərlərə görə cərimə və bloklanma. https://qaynarinfo.az/az/bu-xeberleri-yaymaq-qadaandir-cerime-tetbiq-olundu

11. Hacıyev, T. Müstəqil İKT-si və rabitəsi olan Azərbaycan. https://news.milli.az/hitech/ 314143.html
12. Prezident İlham Əliyev və birinci xanım Mehriban Əliyeva 3 saylı DOST mərkəzinin açılışında iştirak ediblər. https://azertag.az/xeber/ Prezident_ Ilham_Aliyev_ve_birinci_xanim_Mehriban_-Aliyeva_3_sayli_DOST_merkezinin_ achilisinda_istirak_edibler__YENILANIB_VIDEO-1491589

Göndərildi: 17.05.2022 Qəbul edildi: 26.08.2022

DOI: https://doi.org/10.36719/2663-4619/82/21-26

**Gülnar Ramiz qızı Qəmbərova**
AMEA Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutu
filologiya üzrə fəlsəfə doktoru
ms.gulnar_babayeva@mail.ru

# TOFİQ MAHMUDUN NƏSR ƏSƏRLƏRİNİN UŞAQ ƏDƏBİYYATI KONTEKSTİNDƏ TƏHLİLİ

**Xülasə**

Ötən əsrin əvvəllərindən başlayaraq geniş şəkildə inkişaf edən Azərbaycan uşaq nəsri olduqca maraqlı və zəngin inkişaf yolu keçmişdir. Xalqın tarixi və mənəvi dəyərlərini uşaqlara sevdirmək kimi nəcib məqsədlər axtarışında olan uşaq nəsrinin təşəkkülü maarifçilik ideyalarının yayılması və təbliği, həmçinin yeni dərsliklərin, müntəxəbatların tərtibi, yeni tipli məktəblərin açılması uşaq mətbuatı yaratmaq ideyasının gerçəkləşməsi ilə bilavasitə əlaqədar olmuşdur. Məqalədə ötən əsrin 70-80-ci illərində məhsuldar yaradıcılığı ilə səciyyələnən Tofiq Mahmudun uşaqlar üçün yazdığı nəsr əsərlərinin ideya-məzmun xüsusiyyətləri təhlil edilir, onların uşaqlara aşıladığı didaktik-tərbiyəvi əhəmiyyət tədqiqata cəlb edilir.

***Açar sözlər:*** *Tofiq Mahmud, uşaq ədəbiyyatı, nəsr, maarifçilik, əxlaqi-didaktik*

**Gulnar Ramiz Gambarova**

## Analysis of Tofiq Mahmud's prose works in the context of children's literature

**Abstract**

Azerbaijani children's prose, which has been widely developing since the beginning of the last century, has gone through a very interesting and rich development path. The formation of children's prose, which aims to make children love the history and moral values of the people, was directly related to the spread and propagation of the ideas of enlightenment, as well as the compilation of new textbooks and textbooks, the opening of new types of schools, and the realization of the idea of creating a children's press. The article analyzes the idea-content features of the prose works written for children by Tofig Mahmud, who was characterized by his prolific creativity in the 70s and 80s of the last century, and the didactic-educational importance they instilled in children is involved in the research.

***Keywords:*** *Tofig Mahmud, children's literature, prose, enlightenment, moral and didactic*

## Giriş

XIX əsrdə yaranan uşaq nəsrində daha çox folklor və klassik ədəbi ənənələrdən bəhrələnməni müşahidə ediriksə, nisbətən sonrakı dövrlərdə gənc nəslin şəxsiyyət kimi formalaşması üçün bir sıra maraqlı nəsr nümunələrinin yarandığını qeyd etmək olar. Qələmə alınmış bu əsərlər uşaq nəsrinin məzmun və formaca zənginləşməsinə, müstəqil bir sahə kimi genişlənməsinə səbəb oldu. Yeni tipli Azərbaycan nəsri humanizm, insana məhəbbət ideyaları, mənəvi keçmişə – kökə, folklora maraq üzərində təşəkkül tapmışdı. Bu isə öz növbəsində XX əsrdə inkişaf edən realist nəsr üçün bədii-estetik zəmin rolunu oynadı.

XX əsrin əvvəllərində yaranan nəsr əsərlərində elmin, məktəbin əhəmiyyəti xüsusi idi. Nasirlər uşaqların bilik səviyyəsinə və zövqünə uyğun olaraq yazdıqları bu əsərlərdə "...ən çox insanların daxili dünyasına nüfuz etməyə çalışmış, böyük və kiçikyaşlı adamların mənəvi aləmini təsvir predmetinə çevirərək onların hiss və həyəcanlarını, duyğu və düşüncələrini, yaşantılarını bədii söz vasitəsilə əks etdirməyə cəhd göstərmişlər" (Nəbiyev, 1987:89).

30-cu illər üçün səciyyəvi olan uşaq nəsrinin əsas qəhrəmanı inqilabçı surəti idi. Bu sahənin qarşısında duran əsas problemlərdən biri inqilabi mübarizənin bədii inikası idi. Ancaq yaradılmış obrazlar bir-birinə bənzəyirdi, bu isə öz növbəsində sxematik təsvirin yaranmasına səbəb olurdu. Siyasi-ideoloji təbliğat işinə xidmət edən bu əsərlər sonralar öz yerini vətənpərvərlik mövzularında yazılmış nəsr əsərlərinə verdi.

Bildiyimiz kimi, ötən əsrin 40-50-ci illəri İkinci Dünya müharibəsinə təsadüf edir. Müharibənin mənəvi yaraları uşaq nəsrimizin də mühüm mövzularına çevrildi. Müharibənin geniş canlı lövhələri, ön və arxa cəbhədə baş verən hadisələr, döyüşçü surətləri, düşmənə qarşı ümumxalq nifrəti, insanların mənəvi aləmi, nəcib insani sifətlər, sədaqət, mətanət, müharibənin çətinliklərinə sinə gərmək və s. uşaq nəsrinin aparıcı mövzularına çevrildi.

50-ci illərdə yaranan uşaq nəsrinin inkişaf prosesi üçün klassik irsə sağlam və yaradıcı münasibət, folklorla qırılmaz canlı əlaqə, ondan düzgün ideya-estetik meyarla istifadə də səciyyəvidir.

Bu illər ərzində uşaq yazıçılarımız sanki ədəbiyyatın mövqeyini müəyyənləşdirmiş, nəsrin ictimai məzmununu, mənəvi dəyərini gücləndirmiş, mükəmməl, bitkin nəsr əsərləri yaratmış, ardıcıl olaraq yeni bəşəri mövzulara müraciət etmişlər. Həyatın ayrı-ayrı hadisələrinə fəlsəfi baxış güclənmişdi, həyat müşahidələri daha real şəkildə qeydə alınırdı. Yəni uşaq bədii ədəbiyyatının idraki əhəmiyyəti daha aydın hiss olunmağa başladı. Bu illərdə yaradılmış Azərbaycan uşaq nəsri janr və üslub baxımından çox rəngarəngdir (Xəlil, Əsgərli, 2007:78).

60-cı illər və sonrakı illərdə müasir Azərbaycan uşaq ədəbiyyatına, o cümlədən uşaq nəsrinə yeni ab-hava gətirə bilən qələm sahiblərinə böyük ehtiyac var idi. Yeni dövrün tələbi kimi görünən bu aktuallıq hissi həm ədəbiyyatşünasları, həm də nasirləri narahat etməyə bilməzdi. Mətbuatda nəşr olunan hekayələr müxtəlif müəlliflərə məxsus olsa da, onların quruluşu, ifadə tərzi də oxşar təsir göstərir. Oxucunun bu monotonluğu ədəbiyyata maraq aşılayır. Bu dövrdə nəsr sahəsində yeni ədəbi mühit yaratmaq istəyi aydın sezilirdi.

Yaradıcılığa dünya xalqlarının ədəbiyyatından başlayan gənc yazarlar istifadə baxımından "ədəbiyyat nə dərəcədə real olmalıdır?" sualının həllinə müxtəlif nöqteyi-nəzərdən yanaşırdılar. Ədəbi-nəzəri baxışlarına görə bir-birindən bir qədər fərqli olan bu yazıçıların forma və üslubları fərqlidir. Keçmiş SSRİ-nin bir hissəsi olan bütün xalqların ədəbiyyatında yaranan yeni bir proses var idi və bu da ədəbiyyatımızın təbii ədəbi oyanışının formalaşması və inkişafının yeni istiqamətini müəyyənləşdirdi. Ədəbiyyatla ayaqlaşan, "sosialist realizmi"nin siyasi və ideoloji çirkabından xilas olmağa cəhd edən yazıçılar real həyat hadisələrini ədəbiyyata gətirməyə çalışırdılar (Həbibbəyli, 2020:5).

Bu dövrdə yaranan uşaq ədəbiyyatının inkişafı əvvəlki illərin ədəbiyyatından fərqlənir. Bu dövrün uşaq nəsri istər janr baxımından, istərsə də mövzu cəhətdən olduqca rəngarəngdir. Artıq yaranan əsərlərdə insana, onun daxili aləminə diqqət dərinləşdi, xüsusilə, milli-mənəvi dəyərlər qabarıq şəkildə təzahür etməyə başladı. Əvvəlki onilliklərdəki sxematik, quru, şablon bədii vasitələri obrazın daxili dünyasının açılmasına yönələn sənətkarlıq tələblərinə ciddi fikir verildi.

Yeni ədəbi nəslin nümayəndələri T.Mahmud, Z.Xəlil, Ə.Səmədli, M.Aslan, N.Süleymanov, E.Mahmudov, Ə.Babayeva, M.Aslan, B.Həsənov, Ə.Əhmədova, A.Mansurzadə, İ.Hümmətov, Həbibə, X.Hasilova, T.Ağayev, F.Tarverdiyev və başqaları xalqımızın əsrlər boyu formalaşan milli-mənəvi dəyərlərini müasir estetik tələblər baxımından ədəbiyyata gətirdilər, əsasən hekayə və ədəbi nağıllar vasitəsilə kiçikyaşlı oxucuların bədii zövqünə, onlarda yeni milli-mənəvi dəyərlərin formalaşmasına təsir etdilər (Vurğun, 2005).

Yeni yazılan əsərlərdə uşaq obrazları əvvəlki onilliklərdən fərqli olaraq daha mükəmməl təsir bağışlayır, süni, uşaq və yeniyetmələrin marağından uzaq olan dialoqları daha maraqlı, canlı, günün tələblərinə cavab verən dialoqlar əvəz etdi. Bədii obrazların hamısı öz bilik və yaş həddinə uyğun danışmağa başladı ki, bu da uşaq bədii nəsrinin yeni inkişaf yolunda olduğunun göstəricisi oldu. Bu da ilk növbədə milli ədəbiyyatımızın məhdud çərçivədən, şəxsiyyətə pərəstişin buxovundan, ən əsası isə dar çərçivədən azad olduğunu göstərirdi.

Akademik Məmməd Cəfər "Azərbaycan uşaq ədəbiyyatı" adlı məqaləsində bu dövrü geniş təhlil edərək bu sahədə fəaliyyət göstərən gənclərin yaradıcılığı haqqında yazırdı: "İki qurultay arasında uşaq yazıçılarının sıraları kadr cəhətindən xeyli artmışdır. Son dörd ildə təkcə "Pioner" və "Göyərçin" jurnallarında 150-dan artıq müəllif iştirak etmişdir ki, bunlann əksəriyyəti gənclərdir və ya uşaq ədəbiyyatı sahəsində yaradıcılıq təcrübələri etibarilə gəncdirlər. Bunlardan Cahangir Məmmədov, Zahid Xəlil, Əmir Mustafayev, Ağəddin Əliyev, Rəfiq Zəka və bir çox başqalarını göstərmək olar" (Cəfərov, 2019:78).

Bu dövrdə Azərbaycan uşaq nəsri ilə fəal şəkildə məşğul olanlar arasında Tofiq Mahmud yaradıcılığı xüsusilə seçilir. Müxtəlif illərdə şeir, povest, hekayə, poema, nağıl, əfsanə və s. nəsr formasında əsərlərdən

ibarət kitablar çıxaran müəllifin nəsr yaradıcılığı olduqca çoxşaxəli və rəngarəngdir. Həmin kitablardan "Yola çıxıram" (1959), "Dibçək" (1962), "Buzovna qayaları" (1963), "Utancaq oğlan" (1964), "Açıqdır pəncərəm" (1966), "Alpinistlər" (1967), "Meşədə səs" (1969), "Dalğalar" (1976), "Pəncərəyə toxunan budaq" (1978), "Yerə dağılan muncuqlar" (1983), "Gecə qapı döyülür" (1988), "Uzaqda ucalan dağlar" (1991) və s. adlarını qeyd edə bilərik.

Onun nəsr əsərlərini yaş səviyyəsinə görə səciyyələndirsək, həm yeniyetmələr, həm də uşaqlar üçün uyğunluğunu qeyd edə bilərik. Tofiq Mahmudun nəsr əsərlərini janrına görə belə təsnif edə bilərik:

1) Hekayə janrında yazılan əsərlər ("Yerə dağılan muncuqlar", "Meşədə stansiya", "Yağışın nəğməsi", "Kitab mağazasında", "Süsən çiçəkləri", "Dənizə ezamiyyət", "Çanta əhvalatı", "Heyrət", "Yolda", "Son güllə" və s.);
2) Povest janrında olanlar ("Tibb bacısı Leyli", "Dəniz səyahəti", "Gecə qapı döyülür", "Uzaqda ucalan dağlar", "Hil-hil meşəsinin payızı" və s.);
3) Nağıl janrında olanlar ("Arı adam" haqqında nağıllar silsiləsi);
4) Əfsanə janrında olanlar ("Balaca sərkərdə", "Çinar ömrü", "İşıqlı oğlan", "Sehirli meşə", "Bir şamın sirri" və s.) (Mahmud, 1978).

Tofiq Mahmud nəsrində başlıca məziyyət insan amilidir. Onun povest və hekayələrində həyat problemlərinin həlli yolları təsvir edilmişdir. O, bu əsəsrləri ilə uşaq nəsrində yeni cığır açmağa nail oldu. Tofiq Mahmud nəsrin sosial məzmununu və mənəvi dəyərini gücləndirməklə yeni ədəbiyyatın mövqeyini müəyyənləşdirmiş, bəşəri mövzulara ardıcıl müraciət etməklə daha dolğun, bitkin nəsr əsərləri yaratmağa nail olmuşdur. Onun əsərlərində həyat hadisələrinə, insan və lirik-emosional, mənəvi-psixoloji baxışın güclü olduğunu müşahidə etdik.

Tofiq Mahmudun yazıb yaratdığı dövrdə Azərbaycan uşaq nəsrinin çox hissəsini hekayə janrında yazılmış əsərlər təşkil edir. Çevik və operativ janr olan hekayə güclü təsirə və geniş sənətkarlıq imkanlarına malikdir. Uşaq yazarları məhz bu səbəbdən tez-tez bu janra müraciət edirlər. Həm də uşaqlar üçün yazılmış hekayələr həcminə görə qismən kiçik olur, orada bir neçə obraza rast gəlmək olur. Təsvir olunan əhvalatda hadisə sayı az olur ki, uşaqlar asanlıqla mənimsəyə bilsinlər.

Tofiq Mahmud nəsrində hekayə janrında yazılmış əsərlər çoxluq təşkil edir. Müəllifin "Yerə dağılan muncuqlar", "Yapon şalı, rəngbərəng işıqlar və konfetlər", "Meşədə stansiya", "Yağışın nəğməsi", "Kitab mağazasında", "Dənizə ezamiyyət", "Qamışlıqlar arasında", "Çanta əhvalatı" və s. uşaqlar üçün yazılmış hekayələri vardır. Bu əsərlər ideya, mövzu xüsusiyyətlərinə görə olduqca maraqlıdır.

Tofiq Mahmudun yazdığı hekayələr mövzu və problematika baxımından digər əsərlərlə oxşar olsa da, hadisələrə müxtəlif prizmadan yanaşır, onları özünəməxsus şəkildə təsvir və təqdim edərək oxucuların ixtiyarına verir. Bu dövrün nasirlərinin əsas cəhəti problemə müasir kontekstdən yanaşmaq, mövzuya yeni baxış bucağından baxmaq, hadisələri kiçikyaşlı oxucuların yüksək bədii, estetik zövqü səviyyəsindən təhlil etmək, onların diqqətini çəkəcək daha uyğun maraqlı bədii formalar axtarıb tapmaq idi. Tofiq Mahmudun ailə-məişət, elm-təhsil, əxlaqi-tərbiyəvi, milli-mənəvi dəyərlər və s. mövzularda yazdığı hekayələr ümumilikdə dövrün ab-havasını özündə əks etdirirdi.

Oktyabr "inqilabı", Böyük Vətən müharibəsi, Lenin kimi mövzuların üstünlük təşkil edtiyi bir dövrdə yeni məzmunda əsərlər ərsəyə gətirməyə müvəffəq olan Tofiq Mahmud didaktik məzmunlu əsərlər yazmağa önəm verir, hekayələrində təlim-tərbiyə məsələlərini önə çəkirdi ki, bu da uşaq ədəbiyyatında ən önəmli problem kimi daim vacib məsələ olmuşdur. Uşaq yazarlarının əsas mövzusu kiçikyaşlı oxucularda elmə həvəs yaratmaq, kitabın, mütaliənin hər zaman biliklərin yeganə mənbəyi olduğunu anlatmaq, təhsilin insan həyatında mühüm amil olduğunu onlara aşılamaq idi. Bunun üçün müəlliflər obrazların dili ilə, yaratdıqları qəhrəmanların nümunəvi davranışlarını göstərməklə qoyulan problemin həllini verməyə çalışırdılar (Mirzəyev, 1999).

Tofiq Mahmud da digər uşaq yazarları kimi bu maraqlı üsuldan istifadə edərək elmə, təhsilə həvəs yaradacaq məzmunda əsərlər yaratmışdı.

T.Mahmud "Kitab mağazasında" hekayəsində olduqca maraqlı mövzuya toxunmuşdur. Fuadın anası onu tək böyütsə də, heç nədən korluq verməmiş, atasızlığı hiss elətdirməmişdir. Ancaq Fuad anasının fədakarlığını dərk etmir, dərsə getmir, bütün günü dostları ilə əylənir, tüfeyli həyat keçirir. O, anasının çəkdiyi əziyyəti qiymətləndirməkdənsə, onun verdiyi xərcliklə öz gününü keçirir, bütün gün gəzir,

əylənir, hətta əylənmək üçün pulu da anasından alır. Ana artıq usanır, baş verənlərə tab gətirmirdi. Çünki Fuadın atası mütailəyə həvəsli, kitabları çox sevən biri olsa da, Fuadın belə məsuliyyətsiz, bivec olmağı anaya təsir edirdi. Və bir gün Fuad yenə pul istəyəndə ana ona etiraz edir:

– Sənə pul nə üçün lazımdır? Açıq de.
– Yoldaşlarımla gəzməyə gedəcəm.
– Gəzmək üçün bir manat verə bilərəm.
– Bir manat? Eh, o heç tramvay pulu da deyil, barı bir beşlik.
– Yox, Fuad, pulum yoxdur (Mahmud, 1976:249).

Bu söhbətdən sonra Fuad artıq anasından pul istəməyə utanır. Ancaq günlərlə qanıqara gəzir, pula ehtiyacı olduğundan kostyumlarını satır, sonra atasının sevə-sevə aldığı kitabları satmaq qərarına gəlir. Ancaq ordakı satıcı Fuadın bir şəxsiyyət kimi dəyişməsində mühüm rol oynayır, həyatını naz-nemət içərisində keçirmiş, əyləncədən başqa bir şey düşünməyən, qayğısı olmayan Fuad həmin ağsaqqal sayəsində əsl həqiqəti dərk edir. O, Fuadın atasının kitaba, mütailəyə verdiyi dəyərdən bəhs edir, elmin onun üçün vacib amil olduğunu vurğulayır: “İyirmi beş il bundan qabaq... Onda da qış idi. Atanın əynində köhnə bir pencək, soyuqdan əsə-əsə gəldi, bu kitabları aldı... Birinə pulu çatmadı. Mən ona hədiyyə verdim... Rəhmətlik həmişə gəlirdi, həmişə... Boğazından, əynindən kəsib alırdı. Bəs sən niyə satırsan? Sənin ki, 4 hər şeyin var?!” (Mahmud, 1978:250). Bu sözlərdən təsirlənən Fuad vicdan əzabı çəkir, kitablarla geri qayıdarkən anasının onlara necə sevinclə, həyəcanla sarıldığını görür.

Belinskinin təbirincə desək: “...yaxşı uşaq ədəbiyyatı odur ki, həm balacaların xoşuna gəlsin, həm də böyüklərin, özü də yalnız uşaqlara məxsus olmasın, hamı üçün olsun” (Belinski, Vissarion, 1979:78). Tofiq Mahmud da bu hekayədə yalnız elmə, kitaba, təhsilə həvəs yaratmır, eyni zamanda, şəxsiyyətin təkamülünü, müsbət keyfiyyətlərə doğru dəyişməsini ustalıqla nümayiş etdirir, bununla da uşaq ədəbiyyatında əsas motiv olan tərbiyələndirmə üsulundan istifadə edir. Bu vasitə isə hekayənin həm böyüklər həm də kiçiklər üçün yazılmasını aktuallaşdırır.

Sovet dövründə uşaq nəsr əsərləri yaradan yazıçılar sovetlər ölkəsində özünü büruzə verməyə başlayan yeni dövrün ruhuna uyğun tərbiyə olunması, uşaqlarda Vətənə, millətə məhəbbət, milli-mənəvi dəyərlərə və milli şüura sədaqət, həyatda şəxsiyyət kimi formalaşmaq kimi məsələlər prioritet təşkil edirdi. Janr baxımından hekayələrə üstünlük verən yazarlar yeri gəldikdə povest və ədəbi nağıllara da müraciət edir, yaratdıqları əsərlərdə, ilk növbədə, hər hansı bir problemə müasir prizmadan yanaşmaq, uşaqlarda milli özünədərki formalaşdırmaq məqsədi güdür, ən önəmlisi elm və təhsilin insan həyatında nə dərəcədə mühüm amil olduğunu kiçikyaşlı oxuculara çatdırırdılar. Ümumi problemə müxtəlif prizmadan yanaşan yazarlar, öz sələflərinin qələminə sadiq qalır, yeri gəldikdə isə onlara müxalifət təşkil etməkdən çəkinmirdilər.

Azərbaycan uşaq nəsrində məktəb həyatından hekayələrə çox az hallarda təsadüf olunur. Məktəb həyatı, şagirdlərin bir-biri ilə əlaqəsi, müəllim-şagird münasibəti mövzusu Tofiq Mahmud yaradıcılığında mühüm mövqeyə malikdir. O, tələbələrin xarakteri və psixologiyasını daha yaxından şərh etmək üçün hadisələrin dərinliyinə nüfuz edir, problemin mahiyyətini açmağa nail olur. “Yerə dağılan muncuqlar” hekayəsi, “Dəniz səyahəti” povesti belələrindəndir.

“Yerə dağılan muncuqlar” hekayəsində müəllif müəllim-şagird münasibətlərini əsas mövzu obyekti seçib. Zöhrə müəllimə kimya dərsində bədii əsər oxuyan Şəfəqə bərk qəzəblənir, onun dərslə yox, başqa məşğuliyyətlərlə məşğul olmasını ona irad tutur. Şəfəqsə kimya fənnini sevsə də, bədii əsərlərə böyük maraq göstərir, bu əsəri böyük şövq və həvəslə mütaliə edir. Şəfəqin oxuduğu kitabı dostu Namiq ona hədiyyə etmişdir. Bu isə digər sinif yoldaşları Sədrəddinin heç xoşuna gəlmir, müəllimlərə Şəfəqin dərsdən uzaqlaşdığı, ancaq bədii əsər oxuduğu barədə yanlış məlumat verir. “Yerə dağılan muncuqlar” kitabının müəllifi ilə görüş “Mendeleyev dərnəyi” məşğələsi ilə eyni günə təsadüf edir. Şəfəq yazıçı ilə görüşməyə üstünlük verir. Zöhrə müəllimə yazıçıya müraciətlə deyir:

– “Hörmətli yazıçı! Sizin kitabınızdakı Şəfəq, bizim məktəbdə təhsil alan Şəfəq adlı qıza mənfi təsir göstərib. Başlayıb muncuqlar düzəltməyə. Kimyadan soyuyub. Halbuki söz vermişdi ki, ən yaxşı kimyaçı olacaq. İndi fikri-zikri hardadır, heç bilmirəm. Siz buna necə baxırsınız?!” (Mahmud, 1983:234).

Yazıçı Şəfəqi çağırıb ona bir neçə sual verəndən sonra müəyyən etdi ki, kitab Şəfəqə pis təsir etməyib. Əksinə, onun ətraf aləmin gözəlliklərini duyma qabiliyyətinin formalaşdırılmasına imkan yaradıb, Şəfəqdə kimyanın köməyilə təzə muncuqlar yaratmaq kimi ideyanın yaranmasına rəvac verib.

Böyük kimyaçı alim Yusif Məmmədəliyevin xatirə gecəsinə yaxşı hazırlaşan Şəfəq sözün əsl mənasında həm müəllimini, həm də tədbir iştirakçılarını təəccübləndirir. O, alim haqqında maraqlı faktlar toplamış, öz məruzəsində onun elmi fəaliyyətini geniş şəkildə işıqlandırmışdır. Qısa və maraqlı məruzəsi ilə hamının diqqətini cəb etməyi bacaran Şəfəq müəllimlə aralarında olan soyuq münasibəti dəf etməyi bacarır.

Sonralar Şəfəqin boynunda rəngbərəng, parlaq, qəribə formalı muncuqlardan ibarət boyunbağı görən Zöhrə müəllimə təəccübünü gizlədə bilmir, "Nə qəşəngdir! Afərin, Şəfəq!" – deyir. Mendeleyev cədvəlində verilən hər şeyi ətraflı izah edən Şəfəq müəlliminin rəğbətini qazanır, öz hazırladığı boyunbağını ona hədiyyə edir.

Bu hekayədə müəllif yeniyetməliyə yeni addım atan orta məktəb şagirdlərinin həyata baxışlarını, tükənməz sevgisini, arzularını, onların mənəvi saflığını, nəcibliyini, reallığa fərdi yanaşmalarını canlı boyalarla qələmə almışdır. Fikrimizcə, burda yaradılan yazıçı obrazı elə müəllifin özüdür. Müəllif öz obrazını yaratmaqla hadisələrə müdaxilə edir, bununla da oxucu ilə səmimi münasibət qurmağa müvəffəq olur.

"Yapon şalı, rəngbərəng işıqlar və konfetlər" adlı hekayəsinin mövzusu da maraqlı süjet üzərində qurulmuşdur. Bir ailənin timsalında müəllif insanlar arasındakı münasibəti, doğmalığı əxz etməyə çalışmışdır. Atanın paytaxtdan gəlişi zamanı övladlarına aldığı bər-bəzəkli şəfəqli lentlər, sıra-sıra işıqlar, ulduzlar, kağızdan düzəldilmiş quşlar, dovşanlar və bir çox hədiyyələr uşaqların sonsuz sevincinə səbəb olur.

Bu hekayədə müəllif valideyin-övlad münasibətlərini ön plana çəkir. Uşaq psixologiyasının formalaşmasında əsas amil olan valideyn sevgisini vurğulayır, uşaqların xırda şeylərdən belə xoşbəxt ola biləcəyi qənaətinə gəlir. Atanın övladlarına hədiyyə aldığı yolka ağacı yeni il axşamında bəzədilir, hamı tərəfindən sevinclə, maraqla qarşılanır. Onun bəzəkləri, rəngbərəng yanıb-sönən işıqları uşaqların sevgiylə, maraqla yolkaya baxmasına, onun ətrafında dövrə vurmasına, bu gözəllikdən zövq alaraq atalarına təşəkkür etmələrinə səbəb olur.

"Meşədə stansiya" hekayəsində Coğrafiya İnstitutunun meşədə yaratdığı stansiya vasitəsilə torpağı, yağışı, ağacı, havanı müşahidə etmək, təcrübə aparmaq, öyrənmək üçün göndərdiyi nümayəndələri Murad dayı əvvəlcə tanımır, onlara qəzəblə deyir:

– "Sən kimsən? Murad dayı qəzəblə soruşdu, qızın çaşıb qaldığını, dinmədiyini görüb qızışdı.
– Meşə istirahət yeridir? Kim ixtiyar verib ki, həyət salasınız, ev tikəsiniz. Kim, soruşuram, kim?
– Bizim institut.
– Hansı institut?! İnstitutun meşədə nə azarı var? Ev onun nəyinə lazım?!" (Mahmud, 1988:243).

Ancaq sonra gənc ailə onun xoşuna gəlir, onlara əlindən gələn yardımı edir. Müəllif bu hekayədə insanların bir-biri ilə münasibətini, səmimi rəftarını, elmə, kəşfiyyata marağını təsvir etməyə çalışır. Murad dayının timsalında gənclərə yardım etməyin zəruriliyini vurğulayır.

Tofiq Mahmudun yaradıcılığının məhsuldar dövrü ötən əsrin 70-80-ci illərinə təsadüf edir. Bəhs etdiyimiz dövrdə Azərbaycan uşaq ədəbiyyatında folklor motivlərinə müraciət özünü xüsusilə büruzə verir. Sırf şifahi xalq ədəbiyyatının önəmli janrlarından olan nağılın müasir aspektdən işlənməsi və şifahi xalq ədəbiyyatının nağıl qəhrəmanlarımın iştirakı ilə bu günün və gələcəyin mənzərəsi yaradılır.

Qeyd etmək lazımdır ki, hər iki istiqamətdə yaradılan əsərlərdə novator meyillərlə yanaşı, yeni bədii üslub və ifadə tərzləri də özünü göstərirdi. Tofiq Mahmudun yaratdığı hekayə və povestlər, dövr və zaman etibarilə şifahi xalq ədəbiyyatmdakı nağıllardan fərqlənmir. Ədalətlə zülmün, xeyirlə şərin, işıqla qaranlığın mübarizəsindən və vəhdətindən bəhs edən bu nağıllar oxucuları elə kiçik yaşlarından yaxşını pisdən, əyrini düzdən, doğrunu yalandan ayırmağı öyrədir. Bu məqamlar həssas və dərin olduğu üçün yazarlar bu məsələlərə olduqca ciddi yanaşırdılar. Akademik B.Nəbiyev qeyd edir: "Uşaq yazıçılarımız xalq nağıllarından mövzu götürüb işləməklə yanaşı, özləri də yeni nağıllar yazırlar. Əsrlərin imtahanından çıxmış nağıl janrı uşaq qəlbinə, fikrinə təsir göstərmək, onu öz ardınca aparmaq üçün bacarıqlı yazıçının əlində çox gərəkli bir ədəbi vasitədir. Sahildə durub dənizə baxarkən üfüqlə suyun harada birləşib harada

ayrıldığını müşahidə etmək mümkün olmadığı kimi, nağıllarda da bəzən zəngin həyat materialı ilə yaradıcı fantaziyanın bir-biri ilə necə qaynayıb-qarışdığını təyin etmək çətin olar" (Nəbiyev, 1976:148).

## Nəticə

Ümumiyyətlə, Tofiq Mahmud həm hekayə və povestlərində, həm də ədəbi nağıllar yaradarkən dilin sadəliyi, aydınlığına, nağılların daha əyləncəli məzmuna malik olmasına, nağıllarda xalqın həyatı, yaşam tərzi, adət-ənənələrinin müfəssəl təsvirinə daha çox diqqət yetirir.

Ədəbi nağıllarda mürəkkəb məcazlara, qarışıq cümlələrə yer verilmir, əsərin məzmunu birxətli süjet üzrə gedir, mümkün qədər psixologizmdən, dramatizmdən az istifadə edilir. Bu da öz növbəsində yaradılan ədəbi nağılların kiçikyaşlı oxucular tərəfindən rəğbətlə qarşılanmasına zəmin yaradır.

Araşdırmamız zamanı müəyyən etdik ki, nağıl obrazlarının arxasında əsrlərin dərinliklərindən gələn müxtəlif rəmzlər durur. Böyüklərə nisbətən uşaqlara bunlar daha çox anlaşılır.

## Ədəbiyyat

1. Nəbiyev, V. (1987). Zaman və nəsrin üslubları. XX əsrin Azərbaycan nəsrinin əsas üslub istiqamətləri. Bakı: Yazıçı, s.118.
2. Xəlil, Z., Əsgərli, F. (2007). Uşaq ədəbiyyatı. Bakı: ADPU nəşriyyatı, 490 s.
3. Həbibbəyli, İ. (2020). Uşaq dünyasında ədəbiyyat və uşaq ədəbiyyatı. Ədəbiyyat qəzeti, 5 iyun, s.4-5.
4. Vurğun, S. (2005). Seçilmiş əsərləri. "Balalarımız üçün gözəl əsərlər yaradaq". IV Cild. Bakı: Şərq-Qərb, 340 s.
5. Cəfərov, M. (2019). Seçilmiş əsəsrləri. Bakı: Elm, 314 s.
6. Mahmud, T. (1978). Pəncəyə toxunan budaq. Bakı: Gənclik, 360 s.
7. Mirzəyev, Ə. (1999). Azərbaycan uşaq ədəbiyyatı. Bakı: Elm.
8. Mahmud, T. (1976). Dalğalar. Bakı: Gənclik, 134 s.
9. Belinski, Vissarion. (1979). Seçilmiş məqalələri. Bakı: Gənclik, 226 s.
10. Mahmud, T. (1983). Yerə dağılan muncuqlar. Bakı: Gənclik, 270 s.
11. Mahmud, T. (1988). Gecə qapı döyülür. Bakı: Yazıçı, 366 s.
12. Nəbiyev, B. (1976). Tənqid və ədəbi proses. Bakı, 148 s.

Göndərildi: 02.05.2022 Qəbul edildi: 20.08.2022

DOI: https://doi.org/10.36719/2663-4619/82/27-34

**Roza Zhumabay Yesbalayeva**
Nazarbayev Intellectual Schools
yesbalayeva_r@trk.nis.edu.kz
https://orcid.org/0000-0003-1164-9107

# ETHNODEFORMATION OF THE NATIONAL COGNITION IN MODERN KAZAKH PROSE

**Abstract**

The article deals with the traditions and ethnodeformations associated with the funeral, which are found in prose works of Kazakh literature. We often use the phrase "torkaly toi" (solemn celebration), "topirakti olim" (a sorrowful death, when all burial ceremonies are performed by beautifying the dead and all close people of the deceased mourn for his/her passing)" in the sense of joy and sadness. We know that each nation has its own traditions, superstitions, rituals and customs. Although any of these rituals and customs are common to the Turkic peoples, it can be noted that each nation has its own distinctive features. Over the years, both new and old traditions have been deformed and changed due to time. The initial forms of traditions and the ways they have been ethnodeformed can be seen from scientific research, from the conditions of performing rituals and traditions in fiction. To such funeral customs as farewell to the deceased, the ablution of the deceased, the preservation and protection of the corpse, the participation in the washing of the corpse, the praying for the deceased, the burial, there're also such rituals as conveying the tragic news of the deceased to his close relatives, mourning for the deceased, expressing condolences to the family of the deceased, as well as giving memorial dinners after seven, forty, one hundred days and a year in the memory of the dead person. The article provides a definitive analysis of the significance and national cognitive features of such rituals. In particular, the relevance of the article is determined by making systematic comparisons through Mukhtar Auezov's novel-epopee "Abai's way", which describes the national existence of the Kazakh people and national traditions in connection with the events.
***Keywords:*** *deformation, ethnodeformation, definition, funeral, kazakh traditions and customs*

**Roza Jumabay qızı Yesbalayeva**

## Müasir qazax nəsrində milli idrakın etnodeformasiyası

**Xülasə**

Məqalədə qazax ədəbiyyatının nəsr əsərlərində rast gəlinən dəfn mərasimi ilə bağlı adət-ənənələrdən və etnodeformasiyalardan bəhs edilir. "Torkalı toi" (təntənəli bayram), "topiraktı olim" (mərhumun gözəlləşdirilməsi ilə bütün dəfn mərasimlərinin yerinə yetirildiyi və mərhumun bütün yaxınlarının onun vəfatı ilə bağlı yas tutduğu hüznlü ölüm) ifadələrini çox vaxt sevinc və kədər mənasında işlədirik. Məlumdur ki, hər bir xalqın özünəməxsus adət-ənənələri, ritualları var. Bu ayin və adətlərdən hər hansı biri türk xalqları üçün ümumi olsa da, onlarda hər bir xalqın özünəməxsus xüsusiyyətlərinin olduğunu qeyd etmək olar. İllər keçdikcə həm yeni, həm də köhnə adət-ənənələr zamana uyğun olaraq deformasiyaya uğramış və dəyişdirilmişdir. Ənənələrin ilkin formalarını və onların etnodeformasiyaya uğrama yollarını elmi araşdırmalardan, bədii ədəbiyyatda ayin və ənənələrin yerinə yetirilməsi şəraitindən görmək olar. Mərhumla vidalaşma, mərhumun dəstəmazı, meyitin mühafizəsi, meyitin yuyulmasında iştirak, mərhumun duasının oxunması, dəfn edilməsi kimi dəfn adətləri, həmçinin yaxın qohumlara acı xəbərin çatdırılması, mərhumun xatirəsinə matəm elan edilməsi, ailəsinə başsağlığı verilməsi, habelə xatirəsinə yeddi, qırx, yüz gün və bir ildən sonra xatirə süfrələrinin verilməsi kimi ayinlər də mövcuddur. Məqalədə bu cür ritualların əhəmiyyəti və milli idrak xüsusiyyətlərinin təhlili verilmişdir. Xüsusilə, qazax xalqının milli varlığını, milli adət-ənənələrini hadisələrlə bağlı təsvir edən Muxtar Auezovun "Abay yolu" roman-epopeyası vasitəsilə sistemli müqayisələr aparılmaqla məqalənin aktuallığı müəyyən edilir.
***Açar sözlər***: *deformasiya, etnodeformasiya, tərif, dəfn, qazax adət-ənənələri*

## Introduction

In Kazakh prose, a detailed description of the values, customs and rituals that glorify our national traditions reflects the national existence of the nation. Every year, spiritual values of the Kazakh people, such as culture and literature, habits and manners, and national character are updated and finding their continuation up to now. One of them is ritual folklore, which is one of the oldest genres of Kazakh folklore. Ritual folklore continues to unite with the people, intertwine with life values. Among the rich spiritual heritage of A.Baitursynuly, whose name is particularly prominent in the history of Kazakh literature, the collection "23 zhoktau (lamentation)", published in 1926 by the Moscow publishing house "Kunshygys", stands out. Stating that the lamentation "takes four hundred years in the history of the Kazakh people» on the opening page of his book, the author reminds a long history of the folklore mourning genre. In the 100 – volume book "Babalar Sozi", which was published a century after the writing of A. Baitursynov's work, studies on burial rituals were considered as a folklore family ritual. In the study, they classify birth, wedding and funeral rituals and name the rites associated with them. In particular, the 91st volume of poems "Mun-Sher (Sadness-grief)" classifies funeral rites into genres and includes funeral rituals.

Regardless of the time and country, it is a great duty of the living to bury the deceased following all burial rituals with honour (Hoy, William, 2013). Burial rituals have passed through various historical paths of development and are reflected in various forms. In general, the "advanced side" of these traditions is expressed in the task of respecting human feelings, sharing the grief of the grieving soul and being able to look into the soul world of others. The national values formed by the steppe culture, which educates goodness, kindness and mercy in connection with mourning, that is, forgetting of the lungs at the death, sharing of burial duties to help the tragic family and taking care of the people gathered in mourning are reflected in these traditions. In Kazakh folklore, any of the names that are sometimes referred to as a lament, a cry, a lamenting poem, a voice or a grief, or a negative poem, tell about the stages of the origin and development of the lamentation genre.

## Material and methods

Folklore genres related the Kazakh funeral ceremony and research works written in connection with defining their role in Kazakh prose were applied as a study source and served as an important role in determining the article relevance. The main sources were the book "23 Zhoktau" by A.Baitursynuly and the 91st volume of the 100-volume book "Babalar Sozi", the analysis of M.Auezov's novel "Abai's way". The book "Ethnodeformation" of the scientist Zh.Abilov, who introduced the term ethnodeformation into modern Kazakh literature, was the core work in determining the defining nature of Kazakh traditions. In our article, we were guided by the views of the foreign scholars on the funeral rites the Kazakh people in foreign publications and by the works of N. Grodekov, R.Wellek, A.Warren, IRoach Mary, Wilson Jane Wynne and L.Sternberg about features of Kazakh traditions and customs.

## Results and discussion

The novel "Abai's way" was chosen as the study core since the purpose of our research is to tell about the funeral ceremony in Kazakh traditions and customs and define the definition of the rituals associated with the funeral ceremony found in Kazakh prose. In the novel, burial rituals such as conveying the tragic news of the deceased to his close relatives, mourning for the deceased, tying a mourning flag to a grieving home, cutting the mane of the horse of the deceased and setting it free, carrying the corpse for praying and the burial of the deceased are described in detail. Especially in the novel, the death of Bozhei can be a defining manifestation of rituals related to funeral traditions.

"...The three passengers of Bokenshi, who had left their village said: "Bozhei has been sick for five days. In the last few days, the patient's face seemed to be broken. Does Bozhei get shocked?" "Or, as they say "Caution is the parent of safety?". We heard that he had called all his close relatives to say farewell (arazdasu)"" (Auezov, 1997:149-150). Here, arazdasu means to say goodbye before leaving the life, that is, a person who feels that he is leaving forever, says goodbye to his close relatives and friends, saying his final hostage and showing his being pleased. Bozhei, who says farewell in the novel, soon leaves this world.

In the Kazakh tradition, after the death of a deceased person, his close relatives and brothers, respected people are informed of the death. A special messenger is sent to people of special respect. In the novel, Baydaly and Baisal, who have internal enmity to Kunanbai, do not inform him, who expects a special

